*Azərbaycan Aqrar Elmi* 1 2018 *Аграрная Наука Азербайджана*

**UOT: 338.43**

# AQRAR-SƏNAYE KOMPLEKSİNİN İNKİŞAFI ƏRZAQ TƏHLÜKƏSİZLİYİNİN TƏMİN EDİLMƏSİNİN ƏSASI KİMİ

**A. B. ABBASOV, V. O. MAHMUDOVA**
**Azərbaycan Dövlət İqtisad Universiteti**

*Məqalədə aqrar istehsala dövlət dəstəyinin roluna baxılmış, aqrar-sənaye kompleksinin dayanaqlı inkişaf proseslərinin koordinasiya mexanizmi açıqlanmış, təsərrüfatçılığın kiçik aqrar formalarının fəaliyyəti və tənzimlənməsinin xüsusiyyətləri dəqiqləşdirilmiş və sistemləşdirilmişdir. Aqrobiznes subyektlərinin tədiyyəqabiliyyətinin və maliyyə dayanaqlığının yüksəldilməsi istiqamətləri müəyyənləşdirilmişdir.*

***Açar sözlər:*** *aqrar-sənaye kompleksi, ərzaq təhlükəsizliyi, dövlət dəstəyi, aqrar siyasət, təsərrüfatçılığın kiçik aqrar formaları.*

Aqrar-sənaye kompleksi (ASK) ölkə iqtisadiyyatında ən mürəkkəb, çoxsahəli komplekslərindən biridir. ASK sıx iqtisadi və istehsal qarşılıqlı əlaqəli kənd təsərrüfatı məhsullarının istehsalı, tədarükü, nəqli, emalı və saxlanılmasına ixtisaslaşmış, həmçinin aqrar sektoru və emal sənayesini istehsal vasitələri ilə təmin edən sahələrin məcmusudur. ASK ölkənin sosial-iqtisadi inkişafının vəziyyətini, əhalinin qida məhsulları və emal sənayesinin kənd təsərrüfatı xammalı ilə təmin edilməsi səviyyəsini müəyyənləşdirir. Azərbaycanın xalq təsərrüfatı kompleksinin 20 faizi aqrar sektorla əlaqədardır, istehlak mallarının təqribən 70 faizi kənd təsərrüfatı xammalının emalından alınır, pərakəndə mal dövriyyəsinin 50 faizini ərzaq malları təşkil edir.

Azərbaycan Respublikasının sosial-iqtisadi siyasətinin prioritet istiqamətlərindən biri ölkənin ərzaq təhlükəsizliyinin təmin edilməsidir, hansıki ilk növbədə daxili resursların cəlb edilməsinə və onlardan daha səmərəli istifadə olunmasına əsaslanmalıdır. Müasir dövrdə ərzaq təhlükəsizliyinin təmin edilməsi problemi qlobal xarakter daşıyır. İctimai əmək bölgüsünün getdikcə dərinləşdiyi və inkişaf etdiyi bir şəraitdə heç bir müstəqil dövlət, hətta iqtisadi cəhətdən yüksək inkişaf etmiş ölkə milli istehlak bazarının dinamik və tarazlı inkişafının yalnız yerli istehsal hesabına təmin edilməsini istəməz, çünki bu zaman istehsalın iqtisadi, sosial və ekoloji səmərəliliyi mütləq nəzərə alınmalıdır.

Ölkənin ərzaq təhlükəsizliyinin təmin edilməsində ASK-nın inkişafı böyük rol oynayır. Aqrar-sənaye kompleksinin və onun əsas təşkiledicisi olan kənd təsərrüfatının şaxəli inkişafına dair çox saylı Dövlət Proqramlarının və Azərbaycan Respublikası Prezidentinin sərəncamlarının uğurla yerinə yetirilməsi nəticəsində bu gün əhalinin bir sıra əsas qida məhsullarına tələbatı yerli istehsal hesabına ödənilir və yaxın gələcəkdə ölkənin ərzaq təhlükəsizliyinin tamamilə təmin edilməsi strateji hədəf kimi müəyyənləşdirilmişdir. Bu baxımdan ASK-nın inkişafı və ölkənin ərzaq təhlükəsizliyinin təmin edilməsində onun rolunun artırılması ilə bağlı problemlər xüsusi aktuallıq kəsb edir və onların elmi tədqiqinə böyük ehtiyac vardır.

## ASK-nın inkişafına dövlət dəstəyinin forma və mexanizmləri

ASK dövlət üçün müxtəlif istehsal sahələrinin iqtisadi inkişafının və ölkənin ərzaq təhlükəsizliyinin təmin edilməsində prioritet sektor sayılır. İqtisadiyyatın aqrar sektorunun inkişafı üçün zəruri səviyyənin və əlverişli şəraitin formalaşması tədbirləri dövlətin iqtisadi siyasətində öz əksini tapır.

Dövlətin iqtisadi siyasəti müxtəlif alətlər vasitəsilə reallaşır, hansıki istifadəsi cəmiyyətin iqtisadi sisteminin müəyyən məqsədlərə nail olunmasına və onun fəaliyyətinin zəruri rejiminin təmin edilməsinə yönəldilir [1].

ASK-nın dövlət tənzimlənməsi onun inkişafına bazar mexanizmi stimulları əlavə etməklə təsir prosesini və bunun hesabına təsərrüfat subyektlərinin mənfəətli fəaliyyət göstərməsinə və öz rəqabət mövqeyinin yaxşılaşdırmasına imkan yaradılmasını etiva edir. Bu öz növbəsində ölkənin ərzaq təhlükəsizliyinin təmin edilməsi və dünya aqrar bazarında rəqabət mövqeyinin möhkəmləndirilməsi məqsədilə kənd təsərrüfatının effektiv və davamlı inkişafına yönəldilən dövlət siyasətinin iqtisadi, təşkilati-hüquqi və sosial vasitələrinin məcmusudur.

Dövlət ASK-nın, xüsusilə aqrar sektorun davamlı inkişafına dövlət tənzimlənməsinin ayrılmaz hissəsi kimi dövlət dəstəyi şəklində daim konkret kömək və qayğı göstərir. Elmi ədəbiyyatda bu dəstək "dövlət tənzimlənməsi", "maliyyə dəstəyi", "büdcə dəstək sistemi", "sahəyə dövlət köməyi" və başqa anlayışlar kimi işlədilir, baxmayaraq ki, terminlər mahiyyətcə eynidir.

Bəzi müəlliflər dövlət dəstəyi sistemini yalnız maliyyə və büdcə dəstəyinə şamil edirlər. "Dövlət

dəstəyi dövlət büdcəsindən maliyyələşmənin müxtəlif vasitə və alətlərin məcmusudur" fikri ilə qətiyyən razılaşmaq olmaz, çünki büdcə və maliyyə ödənişlərindən başqa dövlət milli əmtəə istehsalçılarının fəaliyyəti üçün əlverişli şəraitin yaradılması məqsədilə müxtəlif təşkilati-iqtisadi tədbirlər də həyata keçirir. Bu debitor borclarının restrukturizasiyasıdır, güzəştli kredit və vergi sisteminin tətbiqidir və s.

Geniş mənada dövlət dəstəyi dedikdə ASK-nın və onun biznes strukturlarının lazımi səviyyədə inkişafının dəstəklənməsi üzrə dövlətin iqtisadi fəaliyyətinin spesifik növü başa düşülür.

Dövlət dəstəyinin forma və mexanizmləri ASK-nın inkişafına və rəqabətqabiliyyətinin yüksəldilməsinə, kənd təsərrüfatının fəaliyyətinin işlək iqtisadi mexanizminin formalaşmasına, istehsal fondlarından və torpaqdan səmərəli istifadəyə, bazar və sosial infrastrukturların inkişafına, kənd yerlərində işsizliyin azaldılmasına və əhalinin rifahının yaxşılaşdırılmasına yönəldilən müəyyən dövlət vəsaitinin xərclənməsilə əlaqədardır.

XXI əsrin səciyyəvi xüsusiyyətlərindən biri bazarların qloballaşması və diversifikasiyası əsasında ölkələrin iqtisadi qarşılıqlı asılılığının güclənməsidir. ASK sferasında xarici iqtisadi əlaqələr milli iqtisadiyyatın inkişafında müstəsna rol oynayır və kompleksin strukturuna və inkişafına təsir edən mühüm amil hesab olunur.

Azərbaycan iqtisadiyyatının aqrar sektoru böyük ixrac potensialına malikdir, hansıki yalnız onun məhsullarının rəqabətqabiliyyətinin yüksəldilməsi, həmçinin dövlətin bank, pul-kredit siyasətinin təkmilləşdirilməsi və ASK-nın biznes strukturlarının inkişafına digər dəstək mexanizmlərindən istifadə edilməsi yolu ilə mümkündür.

ASK müəssisələrinin maliyyələşdirilməsi sahələrin fəaliyyət spesifikasını nəzərə almaqla həyata keçirilir; istehsalın mövsümlüyü, əsas vəsaitlərin təkraristehsalının uzun müddətliliyi, məsariflərin həyata keçirilməsi və son nəticələrin alınması dövrləri arasında vaxt intervalının böyük olması, istehsal proseslərinin fasiləsizliyi, əmək vasitələri və predmetləri qismində canlı orqanizmdən istifadə ilə müəyyənləşdirilir; təkraristehsalın bioloji qanununa tabedir, təbii-iqlim şəraitinin maliyyələşmə mənbələrinə təsirindən, əməliyyat fəaliyyətinin kredit təminatından və təsərrüfat subyektlərinin davamlı inkişafından asılıdır.

ASK-nın inkişafına dövlət dəstəyi "Azərbaycan Respublikası regionlarının sosial-iqtisadi inkişafı Dövlət Proqramları", "Azərbaycan 2020: gələcəyə baxış inkişaf konsepsiyası" və "Milli iqtisadiyyat və iqtisadiyyatın əsas sektorları üzrə strateji yol xəritəsi" çərçivəsində, habelə aqrar sektorun inkişafına dair ölkə Prezidentinin çoxsaylı sərəncamlarının yerinə yetirilməsi gedişində həyata keçirilir. Belə ki, aqrar istehsalçıları stimullaşdırmaq məqsədilə bəzi məhsulların, xüsusilə cins mal-qaranın, kənd təsərrüfatı texnikası və avadanlıqlarının idxalı gömrük rüsumundan azad edilmiş, fermerlərə gübrə, yanacaq materialları və digər istehsal vasitələri ucuz qiymətə satılır.

**Rəqabətli aqroərzaq bazarının formalaşması**

İqtisadi ədəbiyyatda aqrar siyasətin iki strategiyası fərqləndirilir. Liberal-bazar strategiyası çərçivəsində inkişaf əhalinin minimum tələbatının ödənilməsi, lokal bazarlarda işləyən və az məsrəfli texnologiyadan istifadə edən kiçik əmtəə istehsalçıları vasitəsilə qida məhsullarının istehsalı üzrə getməlidir. Kiçik əmtəə istehsalçılarının dominatlığı milli ərzaq bazarının bir sıra qida məhsulları üzrə idxaldan ciddi asılılığına gətirib çıxara bilər [2].

Aqrar strategiyanın alternativ (konservativ) variantı iri istehsalın üstün inkişafında bütün kənd əmtəə istehsalçılarına dəstək bu sektorun çoxsaylı iqtisadi, inzibati və institutsional tədbirlərlə selektiv dövlət dəstəyi siyasəti sayılır. Bu strategiyanın reallaşdırılması nəticəsində effektiv aqrar sfera yaranır, ərzaq təhlükəsizliyi təmin edilir, qida məhsullarına tələbat ödənilir, əhalinin məşğulluğu və gəlirləri artır.

Bizim fikrimizcə, həmin alternativ strategiyalar arasında kompromis aqrar sferanın modernləşdirilməsi ola bilər, hansıki kiçik əmtəə istehsalçılarının kooperasiyasının müxtəlif formalarını stimullaşdırmaqla təmin edilir. Deməli, aqrar sektorun sosial-iqtisadi strukturunun modernləşdirilməsi strategiyasının reallaşdırılması yüksək rəqabətli bazar mühitində əmtəə istehsalçılarının dayanıqlı fəaliyyətinin bərabərhüquqlu maliyyələşdirilməsi üçün şəraitin yaradılması əsasında xüsusi, korporativ və ictimai maraqların hormonizasiyasını təmin edir.

Bütövlükdə, kənd təsərrüfatının strukturunun modernləşdirilməsi alətlər, prinsiplər və metodlar sisteminin tətbiqi əsasında təmin edilir, hansıki məcmu halında onun alət təminatını təşkil edir. Tarixi təcrübə iqtisadiyyatın idarə olunmasının bazar və inzibati metodlarının optimallaşdırılmasının zəruriliyini təsdiq edir. Ona görə də dövlətin iqtisadi siyasətində kənd təsərrüfatı və emal sənayesinin inkişafına dəstək və onun tənzimlənməsi proqramlarının qarşılıqlı əlaqəsi və idarəetmə obyektlərinin özlərinin inkişaf etdirilməsi məqsədilə bazar və dövlət tədbirlərinin əlaqələndirilməsi institutsional dəyişikliklər kontekstində aqrar siyasətin istiqamətlərini əsaslandırmağa imkan verir.

Müasir dövrdə aqrar siyasətin institusional modernləşdirilməsi strategiyasının mühüm istiqaməti maliyyə-iqtisadi böhranının nəticələrinin aradan qaldırılmasıdır. Aqrar sektorun institutsional modernləşdirilməsi strategiyası təkcə transformasiyanın daxili komponentlərinin pozitiv nəticələrini deyil, həm də xarici aqrar bazarda vəziyyəti və aqrar sektorun inkişafının effektiv alətlərinin seçilməsinə təsir edən xarici institutsional dəyişiklikləri mütləq nəzərə almalıdır. Aqrar sektorun modernləşdirilməsi strate-

giyası dövlətin aqroiqtisadi siyasəsinin dominant təşkiledicisi kimi çıxış edir və aqrobiznes subyektlərinin postböhran mərhələsində innovasiyaların tətbiqinə iqtisadi stimullaşdırılması, rəqabətli aqroərzaq bazarının formalaşması ilə şərtlənən artım mənbələrinin tükənməsi şəraitində aktuallaşır.

**Təsərrüfatçılığın kiçik aqrar formalarının inkişafı**

İqtisadiyyatda transformasiya prosesləri təsərrüfatçılığın kiçik aqrar formalarının inkişafına əhəmiyyətli təsir göstərir. Hazırki vaxtda Azərbaycan Respublikası üzrə təsərrüfatçılığın kiçik aqrar formaları (TKAF) kənd təsərrüfatı məhsullarının 40-45 faizini istehsal edir.

Dünyanın inkişaf etmiş ölkələrinin təcrübəsi göstərir ki, inkişaf prosesində baş verən çətinliklər və yüksək risklər səbəbindən aqrar sektorun "kiçik" seqmentinin inkişaf imkanlarından hələ tam istifadə olunmur.

Bizim fikirimizcə, TKAF-nın müasir inkişaf dinamikasının yavaşımasının əsas səbəbi yüksək faiz dərəcəsinə (25-30 faiz) görə kredit bazarına zəif əlçatmasıdır ki, bu da yüksək riskli istehsal sektoru sayılan ASK-da investisiyalaşdırmanın səmərəliliyinə mənfi təsir edir.

ASK-nın davamlı inkişafı təsərrüfatın kiçik aqrobiznes subyektlərinin işinin səmərəlilik səviyyəsindən daha çox asılıdır. Bununla əlaqədar olaraq TKAF-nın inkişafına dəstək kənd təsərrüfatının idarəedici orqanlarının işinin prioritet istiqaməti, dövlət isə ASK və TKAF-nın inkişafının əsas investoru olmalıdır[3].

Təsərrüfatçılığın kiçik aqrar formaların inkişafına dövlətin dəstəyinin və xərclərinin artmasına baxmayaraq, bu sektorda az məhsuldar texnologiyalar tətbiq edilir. Zəif resurs təminatı və kreditləşmədə çətinlik, məhsul təchizatı əsas problem olaraq qalır. Bütün bunlar təsərrüfatçılığın kiçik aqrar formalarının inkişafı və tənzimlənməsinin dövlət və bazar alətlərinin effektivliyinin çox aşağı səviyyədə olması barədə aydın təsəvvür yaradır.

"Təsərrüfatçılığın kiçik aqrar forması"na kifayət qədər kiçik istehsal müəssisələri, məhdud sayda işçilər, məhsulun (xidmətin) istehsalı və satışının həcmi aid edilir. Bu təsərrüfat subyektləri müstəqil mülkiyyətçilər (sahibkarlar) tərəfindən idarə olunur, bazarın marketinq tədqiqatının bütün mərhələlərində, əmtəəlik məhsulun istehsalı, emalı, daşınması, marketinqi proseslərində resurs bazasının üfiqi və şaquli inteqrasiyalaşdırma və kooperasiyalaşdırma, həmçinin son istehlakçıya çatdırmaq və istehsal olunmuş məhsula bazar tələbini ödəmək imkanına malikdirlər. Bu anlayışa kənd yerlərində ASK-nın ilkin və təkrar emal sferasını da aid etməklə baxmaq lazımdır. Hesab edirik ki, kənd təsərrüfatı məhsulları və ərzaq malları istehsal edən bütün ev təsərrüfatları TKAF-na aid edilməlidir. Eyni zamanda qeyd etmək lazımdır ki, bu istehsal kateqoriyası şəxsi yardımçı təsərrüfatlarla birlikdə sahibkarlığa (biznesə) aid deyil, onların strukturunda əsas yeri özünütəminat tutur, yəni mənfəət onların başlıca məqsədi hesab olunur.

Azərbaycan şəraitində "təsərrüfatçılığın kiçik aqrar forması"na ev təsərrüfatları, şəxsi yardımçı təsərrüfatlar, fərdi sahibkarlar kəndli (fermer) təsərrüfatları, kiçik aqrar təşkilatlar və kiçik həcmli istehlak kooperasiyaları aid edilir.

Təsərrüfatçılığın kiçik aqrar formasına aqrar iqtisadiyyatın müstəqil və özünütənzimləyən hissəsi, loqistik informasiya və maliyyə axınlarını, resurs təchizatı, istehsal, emal, elmi, istehsal servisi, nəqliyyat, anbar və digər loqistikanı, məhsulun təchizat və istehlak kanallarını etiva edən dinamik çoxfunksiyalı sistem kimi baxmaq gərəkdir.

TKAF subyektlərinin inkişafına və tənzimlənməsinə dəstək mexanizmini formalaşdırarkən təsərrüfatçılığın regional xüsusiyyətləri mütləq nəzərə alınmalıdır, çünki onlar həm əlverişli (stimullaşdırıcı), həm də neqativ (ləngidici) təsir göstərə bilər. Müxtəlif vəziyyətlərdə eyni xüsusiyyətin müxtəlif istiqamətli (əlverişli, yaxud neqativ) təsiri ola bilər. Bunu nəzərə alaraq TKAF-nın fəaliyyətinin ən xarakterik xüsusiyyətlərini sistemləşdirmək vacibdir, hansı ki xarici mühitlə onların qarşılıqlı hərəkətində təzahür edir.

TKAF subyektlərinin fəaliyyətinin müsbət xüsusiyyətlərinə vergi və sosial imtiyazı, dövlət dəstəyi; səylərin birləşdirilməsinə cəhd, təsərrüfat çətinliyinin aradan qaldırılması üçün kooperasiyalaşma; iş yerlərinin yaradılmasına nisbətən az xərc sərf edilməsi; az ilkin kapital; biznesin başlanğıcında çətinliyin aradan qaldırılması riskinin aşağı olması, qeyri-formal menecment; icra funksiyalarının əvəzlənməsi və s. məsələləri aid etmək olar [4]:

Təsərrüfatçılığın kiçik aqrar formaları subyektlərinin məhsul istehsalına istehsal və istehlak kooperativləşməsinə ənənəvi inamsızlıq; TKAF iştirakçıları arasında qarşılıqlı əlaqənin zəif olması; maliyyələşmə mənbələrinə əlçatmada çətinlik mənfi təsir göstərir ki, bu da iştirakçılara daim müflisləşmə təhlükəsi yaradır, kiçik biznes amillərinin spesifikliyi çox vaxt qanunvericiliyin pozulmasına gətirib çıxarır. Bu gün bank kreditləşməsinə əlçatma çətinliyi, istehsal olunan məhsulun satışının, maddi-texniki təchizat sisteminin və istehsal servisinin iqtisadi səmərəliliyinin çox aşağı səviyyədə olması TKAF-nın fəaliyyətinin ən zəif cəhəti sayılır.

**ASK-nın dayanıqlı inkişafı proseslərinin koordinasiya mexanizmləri**

Aqrar-sənaye kompleksinin dayanıqlı inkişafı ölkənin xalq təsərrüfatı potensialının və onun sosial-iqtisadi inkişafının vəziyyətini müəyyən edir. Bu ASK-nın inkişaf proseslərinin koordinasiyasının müvafiq mexanizmlərinin olmasını tələb edir. Aqrar-sənaye istehsalının davamlı inkişafı üçün əlverişli

şəraitin yaradılmasında vacib olan anlardan biri ASK sferası, yerli strukturlar və cəmiyyət arasında qarşılıqlı münasibətlərin işlək və aktiv mexanizminin qurulmasıdır.

ASK müəssisələrinin fəaliyyətinin iqtisadi şəraitinin yaxşılaşdırılması üzrə dövlət səviyyəsində tədbirlər həyata keçirilir, hansıki iqtisadi artım tempinin sürətləndirilməsini və ümumdaxili məhsulun artırılması üzrə müəyyən edilmiş hədəfə çatmaq üçün onun davamlı və dinamik inkişafını təmin etməlidir.

ASK-nın davamlı inkişafı proseslərinin təşkilində mühüm məsələlərdən biri idarəetmənin bütün mərhələlərində aqrobiznes subyektlərinin fəaliyyəti üçün dövlət tərəfindən əlverişli şəraitin yaradılmasıdır. ASK-nın davamlı inkişaf proseslərinin koordinasiyasının əsas vəzifəsi hakimiyyət, biznes və cəmiyyət arasında səmərəli əlaqələrin qurulması və informasiya mübadiləsi yolu ilə razılaşmağa nail olmaqdır.

Koordinasiya funksiyası sayəsində strukturun dinamizmi təmin edilir, onun elementlərinin qarşılıqlı əlaqəsinin harmoniyası yaradılır, bazarda struktur daxilində resurslarla rasional manevr edilir. Koordinasiyanın obyektini elementlər və strukturun alt sistemi təşkil edir. Koordinasiya bütün elementlərin, altsistemin hərəkətlərinin vəhdətliyini və onların qarşıya qoyulan vəzifəyə daha effektiv və operativ şəkildə nail olunması maraqlarına söykənən inteqrasiyasını təmin edir [5].

Aqrar-sənaye kompleksinin inkişafının koordinasiya mexanizmini ölkənin ərzaq təhlükəsizliyinin təmin edilməsi məqsədilə əhalinin qida məhsullarına və sənayenin isə kənd təsəsrrüfatı xammalına tələbatının ödənilməsinə baxmayaraq ASK-nın fəaliyyətinin rəqabətqabiliyyətliliyini yüksəltmək üçün aqrobiznesin məqsədləri və qərarlarının razılaşdırılması və əlaqələrin qurulması, sahəvi və səviyyəli qarşılıqlı hərəkətin təmin edilməsi prosesi kimi dəyərləndirmək lazımdır. Bununla əlaqədar ASK-nın formalaşması və davamlı inkişaf proseslərinin koordinasiya mexanizminin modeli qurulmalı, hansıki aqrar-sənaye istehsalının idarə edilməsi sisteminin qarşılıqlıəlaqəli və ixtisaslaşmış struktur bölmələrinin struktur-məzmununun əsasını təşkil edir.

Aqrar-sənaye kompleksinin dayanıqlı inkişafının başlıca komponenti maliyyə dayanıqlığıdır. ASK-nın maliyyə dayanıqlığını qiymətləndirmək üçün onun maliyyə vəziyyətini qiymətləndirmək lazımdır, hansıki maliyyə resurslarının formalaşması, bölüşdürülməsi və istifadəsində ifadə olunur. Bu cür qiymətləndirmə təhlilin məntiqini, həmçinin nağd maliyyə resurslarının formalaşması, bölüşdürülməsi və istifadəsi ilə bağlı bütün proseslərə ardıcıl və mərhələli baxılmasının vacibliyini əvvəlcədən müəyyənləşdirir.

Maliyyə dayanıqlığının təhlili və idarə edilməsi şirkətin maliyyə-iqtisadi xidmət strukturunun işinin mühüm aspektidir, planlaşdırma və operativ idarəetməni, bütövlükdə şirkətin və onun bölmələrinin çevik təşkilati strukturunun yaradılmasını əhatə edən bir sıra təşkilati tədbirləri etiva edir. Beləliklə, maliyyə dayanıqlığı və tədiyyəqabiliyyəti müasir bazar iqtisadiyyatı şəraitində şirkətin maliyyə-iqtisadi fəaliyyətini xarakterizə edən əsas göstəricilərdir.

Maliyyə ehtiyatının formalaşması mənbələrini çoxaltmaq üçün bölüşdürülməyən mənfəətin, yaxud vergitutulandan sonra yığım fonduna ayrılan mənfəətin hesabına real xüsusi kapitalın həcmini artırmaq lazımdır. Maliyyə ehtiyatının artması, ehtiyat qalığının planlaşdırılması, həmçinin istifadə olunmamış əmtəə-material dəyərlilərinin satılması nəticəsində baş verir.

Maliyyə ehtiyatının vəziyyətinin dərindən və hərtərəfli qiymətləndirilməsi şirkətin maliyyə vəziyyətinin daxili təhlilinin tərkib hissəsi qismində çıxış edir, hansıki mühasibat uçotunda əks etdirilməyən və analitik uçotun məlumatlarını tələb edən ehtiyat haqqında informasiyadan istifadə olunmasını nəzərdə tutur. Müasir dövrdə təkcə şirkətin maliyyə vəziyyətini təhlil etmək kifayət deyil, həm də maliyyə dayanıqlığını proqnozlaşdırmaq, maliyyə vəziyyətinin yaxşılaşdırılması istiqamətində tədbirlər işləyib hazırlamaq və həyata keçirmək lazımdır.

Şirkətin kifayət qədər xüsusi dövriyyə vəsaitinin olmaması heç də onun milli bazarda uğurla fəaliyyət göstərməsinə, mənfəət, likvidlik, rentabellilik, əmək məhsuldarlığı və digər səmərəlilik göstəricilərinin artırılmasına mane olmur, çünki şirkət maliyyə cəhətdən kreditorlardan, banklardan və digər maliyyə-kredit təşkilatlarından asılıdır [6]. Belə ki, təsərrüfat subyekti dövriyyə vəsaitlərinin itkisini yeni istiqraz vərəqələri buraxmaq yolu ilə kompensasiya edə bilər. Əlavə dövriyyə və xüsusi vəsaitlərin formalaşması mənbələrinin formalaşması şirkətə imkan verir ki, yeni texnologiyaları tətbiq etsin, istehsalı modernləşdirsin, təchizat bazarını genişləndirsin və s.

**Nəticə**

1. Aqrar-sənaye kompleksi ölkənin ərzaq təhlükəsizliyinin təmin edilməsində müstəsna rol oynayır, belə ki, o əhalini geniş çeşidli qida məhsulları və istehlak malları, emal sənayesini isə kənd təsərrüfatı xammalı ilə təmin edir.

2. Bazar iqtisadiyyatı şəraitində dövlət dəstəyi olmadan ASK və onun biznes strukturlarını davamlı və dinamik inkişaf etdirmək qeyri-mümkündür. Dövlət dəstəyi Proqramında nəzərdə tutulan tədbirlərin uğurla həyata keçirilməsi üçün iqtisadi, maliyyə və təşkilatı mexanizmlərin qarşılıqlı fəaliyyətində proqram-məqsədli metoddan istifadə edilməsi zərururidir.

3. Aqrar-sənaye kompleksinin inkişafı proseslərinin idarə olunmasının müxtəlif mexanizmlərinin sistemli tətbiqi şəraitində təsərrüfat subyektlərinin

davamlı inkişafına nail olmaq və onların fəaliyyətinin səmərəliliyini artırmaq, əhalinin məşğulluğunu təmin etmək və sosial həyat tərzini yaxşılaşdırmaq mümkündür. ASK-nın biznes strukturlarının davamlı inkişafı proseslərinin koordinasiya mexanizminin praktikada tətbiqi həm regionlar, həm də bütövlükdə ölkə səviyyəsində onların maliyyə-təsərrüfat fəaliyyətinin iqtisadi səmərəliliyinin əhəmiyyətli dərəcədə yüksəldilməsinə səbəb ola bilər.

4. ASK müəssisələrinin maliyyə dayanıqlığı və tədiyyəqabiliyyəti göstəricilərinin müəyyənləşdirilməsi ən mühüm iqtisadi problemlər sırasına daxildir. Belə ki, maliyyə dayanıqlığının aşağı olması müəssisənin tədiyyəqabliyyətinə mənfi təsir edir və geniş təkrar istehsal üçün vəsait qalmır. Deməli, maliyyə dayanıqlığı bazarın tələbinə uyğun gələn və müəssisənin gələcək inkişafı üçün tələb olunan maliyyə resurslarının real vəziyyətini xarakterizə edir.

5. Kənd təsərrüfatı əmtəə istehsalçılarının büdcə maliyyələşdirməsi dövlətin mühüm maliyyə dəstəyi sayılır və büdcə proqramı üzrə həyata keçirilir, hansıki aqrar müəssisələrin fəaliyyətinin bütün istiqamətlərini, xüsusilə güzəştli kredit və vergi sisteminin tətbiqini, fermerlərə kənd təsərrüfatı texnikası və avadanlıqlarının alınmasında kömək göstərilməsini əhatə edir. ASK-nın inkişafına dəstək məqsədilə ayrılmış dövlətin büdcə vəsaitlərindən səmərəli istifadə edilməməsinin əsas səbəbi büdcə vəsaitlərinin alınması və bölüşdürülməsi mexanizminin təkmil olmamasıdır, həm də onlardan istifadə zamanı büdcə intizamının pozulmasıdır.

## ƏDƏBİYYAT

**1.** Вернигор Н.Ф. Государственная поддержка сельского хозяйства неотъемлемая часть государственного регулирования. Вестник Алтайского Государственного Университета. 2015, № 2, 143-148 с. **2.** Национальная экономика: обеспечение продовольственной безопасности в условиях интеграции и глобализации. Монография. М.:ИНФРА-М. 2014, 238 с. **3.** Грищин Е.В. Повышение конкурентных возможностей субъектов малых аграрных форм хозяйствования. Политематический сетевой электронный научный журнал Кубанского Государственного Университета. 2016, № 119, 159-173 с. **4.** Саятова Р.В. и др. Координация и её направления в свеклосахарном подкомплексе АПК. Вестник Курской Государственной Сельскохозяйст-венной Академии. 2014, № 2, 29-31 с. **5.** Красникова Ю.М. Управление дебиторской задолженностью в организациях. Новая наука: Проблемы и перспективы. 2016, № 3, 108-110 с. **6.** Чекрыгина Т.А. Организация бухгалтерского учета и внутреннего контроля расчетов с покупателями и заказчиками и дебиторской задолженности в сельскохозяйственных организациях. Экономика и предпринимательство. 2014, № 12, 520-523 с. **7**. Михайлюк О.Н. Формы государственной поддержки субъектов хозяйствования АПК. Экономика сельскохозяйственных и перерабатывающих предприятий. 2009, № 7, 36-39 с. **8**. Терешин Е.М., Володин В.М. Координация и систем – но синергетический подход к координации в кластерах. Экономические науки. 2010, № 4, 143-146 с.

### Развитие агропромышленного комплекса как основы обеспечения продовольственной безопасности

**А. Б. Аббасов, В. О. Махмудова**

В статье рассмотрены роль государственной поддержки аграрного производства, раскрыта механизмы координации процессов устойчивого развития АПК, уточнены и систематизированы особенности функционирования и регулирования малых аграрных форм хозяйствования. Определены направления повышения платежеспособности и финансовой устойчивости субъектов агробизнеса.

***Ключевые слова:*** агропромышленный комплекс, продовольственный безопасность, государственная поддержка, малые аграрные формы хозяйствования

### Development of the agro-industrial complex as a basis for ensuring food security

**A. B. Abbasov, V. O. Makhmudova**

The article examines the role of state support for agrarian production, reveals mechanisms for coordinating the processes of sustainable development of the agro-industrial complex, specifies and systematizes the features of functioning and regulation of small agrarian forms of management. The directions of increasing the solvency and financial sustainability of agribusiness entities are determined.

***Key words:*** agro-industrial complex, food security, state support, small agrarian forms of management

email - alıcan.abbasov@gmail.com
vafa_mahmudova@mail.ru